# Təhsil və mədəniyyət sahəsində Azərbaycan-Osmanlı əməkdaşlığı (1918-ci il)

**Vasif Qafarov**

**Müəllif:**
Vasif Qafarov — AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun aparıcı elmi işçisi, tarix üzrə fəlsəfə doktoru, dosent. E-mail: vasifqafarov@rambler.ru

**Açar sözlər:**
maarif, məktəb, Türk pedaqoqları, Türk Ocağı, Azərbaycan Türk Dram Operetta kompaniyası.

**Annotasiya.** Azərbaycan Xalq Cümhuriyyəti hökuməti yarandığı ilk gündən etibarən ölkənin ərazi bütövlüyü və suverenliyini təmin etmək üçün ciddi addımlar atmaqla yanaşı, ölkənin dirçəlişi naminə əsas amil hesab etdiyi maarif və mədəniyyətin inkişafına da böyük əhəmiyyət vermiş, ölkədə sabitlik möhkəmləndikcə bu sahəyə daha çox diqqət ayırmağa başlamışdır. Azərbaycan hökuməti hərbi-siyasi və iqtisadi sahələrdə olduğu kimi, maarif sahəsində də dost və qardaş Türkiyə ilə əməkdaşlıq etmiş, onun köməyindən və təcrübəsindən faydalanmışdır.
Məqalədə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasından 1918-ci ilin sonlarınadək olan dövrdə təhsil və mədəniyyət sahəsində Azərbaycan-Osmanlı əməkdaşlığı araşdırılmışdır. Bu əməkdaşlıq nəticəsində Azərbaycan gənclərinin Türkiyə ali məktəblərində təhsil alması, Azərbaycana türk müəllim kadrlarının göndərilməsi, həmçinin yerli müəllim kadrlarının hazırlanması işinin təşkili, ölkədəki məktəb və gimnaziyaların Türkiyədə nəşr edilmiş dərslik, dərs vəsaitləri və proqramları ilə təmin edilməsi sahələrində mühüm nəticələr əldə edildi. Eyni zamanda, uzun illər ərzində bir-birindən ayrı düşmüş Azərbaycan və Türkiyə xalqlarının mədəniyyət nümunələri qarşılıqlı olaraq təbliğ edildi.

**DOI:**
**Məqaləyə istinad:** Vasif Qafarov. Təhsil və mədəniyyət sahəsində Azərbaycan-Osmanlı əməkdaşlığı (1918-ci il). *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh. 125–137

**Məqalə tarixçəsi**
Göndərilib: 23.05.2018; Qəbul edilib: 28.06.2018; Nəşr edilib:

# Azerbaijani-Ottoman cooperation in the field of education and culture (1918)

**Vasif Gafarov**

**Author:**
Vasif Gafarov,
Leading scientific researcher of the Institute of History named after A.Bakikhanov of Azerbaijan National Academy of Sciences, PhD in history, associate professor. E-mail: vasifqafarov@rambler.ru

**Keywords:**
education, school, Turkish pedagogues, Azerbaijan Turkish Drama Operetta Company.

**Abstract.** From the very first day of the establishment of the government of the Democratic Republic of Azerbaijan, serious steps have been taken to ensure the territorial integrity and sovereignty of the country. This government also attaches great importance to the development of education and culture, which it considers a major factor in the revival of the country, and began to pay more attention to this area, since the stability of the country has increased. The Azerbaijani government has cooperated with the friendly Republic of Turkey in the field of education, as well as the military-political and economic spheres, as well as helping her in her care and experience.
The article examines Azerbaijani-Ottoman cooperation in the field of education and culture during the period from establishment of the Republic of Azerbaijan to the end of 1918. As a result of this cooperation, significant results were achieved in the field of Azerbaijani youth receiving education in Turkish universities, sending Turkish teachers to Azerbaijan, as well as organizing training of local teachers, providing schools and gymnasiums with textbooks and programs published in Turkey. At the same time, cultural values of the peoples of Azerbaijan and Turkey, habe been separated for many years, were mutually propagated.

**DOI:**
**To cite this article:** Vasif Gafarov. Azerbaijani-Ottoman cooperation in the field of education and culture (1918). *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 125–137

**Article history**
Received: 23.05.2018; Accepted: 28.06.2018; Published:

Azərbaycan Xalq Cümhuriyyəti yaradıldıqdan sonra ölkənin ərazi bütövlüyü, suverenliyi və dağılmış iqtisadiyyatının bərpa edilməsi kimi böyük problemlərlə qarşı-qarşıya dayanan cümhuriyyət hökuməti təhsil və mədəniyyət sahələrini də diqqətdən kənarda saxlamadı. Azərbaycanın baş naziri F.X.Xoyski və ilk üç hökumətdə maarif naziri vəzifəsini tutmuş N.Yusifbəylinin milli mədəniyyətə bağlı və maarifpərvər bir ziyalı olması da bu işdə mühüm rol oynadı. Azərbaycan hökuməti xalqın maariflənməsinə, təhsilin milliləşdirilməsinə və yeni məktəblərin açılmasına böyük diqqət yetirirdi. Çünki bu sahədə hökm sürən vəziyyət ürəkaçan deyildi.

Birinci Dünya müharibəsi və Rusiyada baş vermiş inqilabi hadisələrlə bağlı Cənubi Qafqazda tüğyan edən anarxiya maarif sahəsinə də öz mənfi təsirini göstərmişdi. Əgər 1914-cü ildə Azərbaycanda bütün tiplərdən olan 976 məktəb var idisə və bunlarda 73.100 şagird təhsil alırdısa, 1919-1920-ci təhsil ilində cəmi 643 ibtidai və 23 orta məktəb fəaliyyət göstərirdi. İbtidai məktəblərdə 78.078, orta məktəblərdə isə 9611 şagird oxuyurdu [Azərbaycan tarixi, 2001, Bakı]. Məktəb sisteminin bu şəkildə dağılmasının qarşısını almaq və maarifi inkişaf etdirmək Azərbaycan hökumətinin qarşısında duran mühüm vəzifələrdən biri idi. Bu işi uğurla həyata keçirmək üçün Türkiyənin köməyindən və təcrübəsindən istifadə etmək də nəzərdə tutulmuşdu.

Bəhs edilən dövrdə Azərbaycanda məktəb və maarif sisteminin böhranlı vəziyyəti ilə bağlı İstanbul mətbuatında kinayəli yazılar belə yazılırdı. Məsələn, «Ati» qəzetinin 6 avqust 1918-ci il tarixli, 215-ci saylı nömrəsində nəşr olunmuş «Azərbaycan Cümhuriyyətində maarif» məqaləsində ölkədəki maarifin bərbad vəziyyətdə olması və bu sahədə böyük zəhmət və kifayət qədər maliyyə tələb edən ciddi işlərin görülməli olduğu qeyd edilirdi. Məqalədə obrazlı şəkildə yazılırdı: «Bu kiçik cümhuriyyətin maarif naziri (N.Yusifbəyli nəzərdə tutulur — V.Q.) başında olduqca böyük bir şapka daşıyır. Bir gün öz otağında şapkasını qarşısına qoymuş, başını əllərinin arasına alaraq dərin-dərin düşünərkən özündən soruşmuşdu: «Heç şübhəsiz, Azərbaycanın maarif ehtiyacını düşünürsünüz, elə deyilmi?»

«Bəli, əzizim, bu məsələni düşünürəm və Azərbaycanın mədəni səviyyəsini İstanbuldakına çatdırmağın çarəsini axtarıram. Fəqət...»

Görəsən bu «fəqət» nə olurdu? Maarif naziri ümidlərinin nəhayətini bu şəkildə birdən-birə soyuq bir «fəqət»lə bağlamışdı? Sonra anlaşıldı ki, o, «pul harda?» demək istəyirdi...»[1] . Məqalə müəllifi, Azərbaycanda maarifin inkişafı üçün maliyyə mənbəyinin Bakı nefti olduğunu göstərir. Lakin bəhs edilən dövrdə Bakı hələ Azərbaycan hökumətinin nəzarətində deyildi və hökumət bütün diqqətini bu şəhərin azad edilməsinə yönəltmişdi. Bəhs olunan dövrdə maliyyə imkanları məhdud olmasına baxmayaraq, Azərbaycan hökuməti ölkədə maarifin bərpa və inkişaf etdirilməsi üçün əlindən gələni əsirgəmədi, eyni zamanda bu sahədə yardım üçün Osmanlı hökumətinə də müraciət etdi.

Azərbaycan hökuməti 1918-ci il iyunun 22-də Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan bölməsinin Tiflisdən Qazaxa köçürülməsi üçün bu bölmənin sabiq müfəttişi Firidun bəy Köçərlinin sərəncamına 5 min rubl kredit ayrılması haqqında qərar verdi.[2] F.Köçərli bu vəsait hesabına Azərbaycan şöbəsinin əmlakının Qoridən Qazaxa daşınıb gətirilməsini təmin etməli idi. Seminariyanın köçürülməsi başa çatdırıldıqdan az sonra, 1918-ci il noyabrın 8-9-da həyata keçirilən imtahan nəticələrinə görə 35 nəfər seminariyaya qəbul edildi. Azərbaycanda ibtidai məktəblər üçün müəllim hazırlayan tədris ocağı kimi bu seminariya böyük əhəmiyyətə malik idi.

Azərbaycan hökumətinin 27 iyun 1918-ci il tarixli qərarı ilə Azərbaycan (türk) dili dövlət

---

[1] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. №10505.s. 2.

[2] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915.s. 2.

dili elan edildi.[3] Bu qərarı həyata keçirmək üçün hökumət orqanları ilə yanaşı, ölkədəki təhsil müəssisələrində də tədrisin rus dilindən Azərbaycan dilinə keçirilməsi zəruri idi. Ümumiyyətlə, təhsili milli mənafeyə yönəltmək və milli dövlətçiliyin tələblərinə uyğun yenidən qurmaq üçün məktəblərin milliləşdirilməsi vacib idi. Bunun üçün öncə Azərbaycan dilində dərs deyəcək müəllim və lazımi dərsliklərin çatışmazlığı kimi problemlər həll edilməli idi. Eyni zamanda, ölkədəki rus və erməni azlıqlarının Azərbaycan dövlətçiliyini tanımamağa yönələn müqaviməti də təhsilin milliləşdirilməsini əngəlləyirdi. Bütün bu çətinliklərə baxmayaraq, hökumət məktəblərin milliləşdirilməsi ilə bağlı siyasətini həyata keçirməkdə qərarlı idi. Azərbaycanın məktəblərinin milliləşdirilməsini həyata keçirmək üçün Türkiyədən müəllimlərin dəvət edilməsini və dərsliklərin gətirilməsini zəruri hesab edən hökumət bu məqsədlə 1918-ci il iyulun 22-də İstanbula səriştəli bir şəxsin ezam olunması haqqında qərar verdi.[4] Bu qərar üzrə müəyyən işlər görüldükdən sonra hökumət, 1918-ci il avqustun 28-də məktəblərin milliləşdirilməsi haqqında qərar qəbul etdi.[5] Qərara əsasən bütün ibtidai tədris müəssisələrində təhsil ana dilində aparılmalı, eyni zamanda dövlət dili icbari qaydada tədris olunmalı idi. Bütün ali, ibtidai və orta təhsil müəssisələrində tədris dövlət dilində aparılmalı idi.

1918-ci ilin iyul ayında maarif naziri N.Yusifbəyli Türkiyədən Azərbaycana çox sayda müəllim kadrlarının və dərs vəsaitlərinin göndərilməsi ilə bağlı İstanbuldakı Azərbaycan nümayəndə heyətinin rəhbəri M.Ə.Rəsulzadəyə müraciət etdi. Bu müraciətlə bağlı olaraq M.Ə.Rəsulzadə İstanbulda fəaliyyət göstərən Qafqaz Tərəqqi Cəmiyyətinin sədri Məsud Əfəndi ilə görüşdü. Üzvləri, əsasən, mühacir azərbaycanlılardan ibarət olan və Osmanlı hökuməti tərəfindən dəstəklənən Qafqaz Tərəqqi Cəmiyyəti gələcəkdə Qafqaz müsəlmanlarının Osmanlı imperiyasına birləşməsinə zəmin hazırlamaq üçün bölgə ilə Türkiyə arasında əlaqələrin genişləndirilməsi və Qafqaz müsəlmanlarının İstanbulda təhsil almalarına yardım etmək kimi işlərlə məşğul olurdu.[6] M.Ə.Rəsulzadə bu cəmiyyətdən xahiş etdi ki, əslən qafqazlı olub, müəyyən ixtisasa sahib olan və məmləkətlərinə getmək istəyən şəxslərin siyahısını tutsunlar və ünvanlarını qeyd etsinlər.[7] M.Ə.Rəsulzadə Azərbaycan hökumətinə göndərdiyi 19 iyul 1918-ci il tarixli məktubunda İstanbuldan dərslik və digər kitabların alınıb göndərilməsi üçün heç bir maneənin olmadığını və buna görə də kitab işinin asan olduğunu vurğulayır, lakin tələb edilən qədər müəllim tapıb göndərməyin hazırkı zamanda müşkül olacağını bildirirdi.[8]

O, Azərbaycan hökumətinə göndərdiyi 29 iyul 1918-ci il tarixli növbəti məktubunda tələb edilən kitablarla bağlı Nəsib bəyin təfsilatlı məlumat və müfəssəl siyahı göndərməsini xahiş edir və qeyd edirdi ki, Osmanlı maarif naziri ilə görüşüb bu məsələni həll etməyə çalışacağam.[9]

M.Ə.Rəsulzadə 1918-ci ilin avqust ayında Osmanlı maarif naziri Nazim bəylə görüşüb bu məsələni həll etməyə çalışdı. İlkin olaraq, Azərbaycana bəzi dərs vəsaitləri ilə 17 müəllimin göndərilməsi qərarlaşdırıldı.[10]

Bir qədər sonra Azərbaycanın Türkiyəyə səfiri təyin edilən Ə.Ə.Topçubaşov da Osmanlı hökumət nümayəndələri ilə apardığı danışıqlarda Azərbaycana türk müəllim kadrlarının və dərs vəsaitlərinin göndərilməsi məsələsini gündəlikdə saxladı. O, 1918-ci il oktyabrın 28-də Osmanlı Maarif Nazirliyinin

---

[3] Azerbaycan Hariciye Nazırı ile Gayri Siyasî Bir Mülakat (1334). Temaşa. № 8. s. 12.

[4] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[5] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[6] Rusyalı İslam Şâkirdlerine Yardım Cemiyeti (1334). Tanin, № 3414. s. 4.

[7] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

[8] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

[9] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

[10] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

müstəşarı ilə keçirdiyi görüşdə Türkiyədən Azərbaycana müəllim və müəllimələr göndərməklə bağlı təmsil etdiyi hökumətin 4 ay əvvəl etdiyi müraciəti xatırladıb, bu məsələnin müsbət həll edilməsi üçün köməklik göstərilməsini xahiş etdi. Müstəşar bu haqda nazirə məlumat verəcəyini və məsələnin tezliklə müsbət həll edilməsinə çalışacağını vəd etdi.[11]

Onu da qeyd edək ki, türk pedaqoqları Azərbaycanda çalışmağa böyük maraq göstərirdilər. Müəllim kadrları ilə bağlı Azərbaycan tərəfinin müraciəti haqqında məlumat alan türk pedaqoqları könüllü şəkildə həm Osmanlı Maarif Nazirliyinə, həm də İstanbuldakı Azərbaycan nümayəndəliyinə müraciət edərək, Azərbaycana gedib orada çalışmaq istədiklərini bildirirdilər. Buna görə də Ə.Ə.Topçubaşov Osmanlı maarif müstəşarı ilə keçirdiyi görüşdə Azərbaycana getmək üçün müraciət edən müəllimlərin hamısının birlikdə İstanbuldan yola salınmasını və bu barədə Azərbaycan tərəfini məlumatlandırmağı xahiş etdi. Müstəşar Azərbaycanda işləmək arzusunda olanların hamısı haqqında tezliklə lazımi məlumatlar toplamağı və onların ən qısa müddətdə gəmi ilə Batuma yola salmağı öhdəsinə götürdü [Топчибашев А.А., 1994, s. 26-27].

Ə.Ə.Topçubaşov 1918-ci il noyabr ayının 30-da «Təsvir-i Efkar» qəzetində dərc edilən geniş bəyanatında Azərbaycanda məktəb və maarifin vəziyyəti və təhsilin milliləşdirilməsi ilə bağlı görülən işlər haqqında məlumat verdikdən sonra Türkiyədən Azərbaycana müəllim kadrlarının cəlb edilməsi məsələsi ilə bağlı qeyd edirdi ki, «Az sonra köhnə dostum olan maarif naziri Rıza Tevfik bəylə bu işlər üçün görüşməyə gedəcəyəm. Bir siyahı hazırlayırıq. Arzu edən müəllim və müəllimələri təyin edib Azərbaycana göndərilmələri işlərini həll etməyə çalışacağıq».[12] Azərbaycan nümayəndəsinin bu bəyanatı geniş rezonans doğurdu.

Bu təşəbbüslərin nəticəsi olaraq bir qədər sonra Azərbaycana kifayət qədər türk pedaqoqları göndərildi və onlar öz missiyalarını həyata keçirdilər. Artıq 1919-cu ilin noyabrında Azərbaycanda fəaliyyət göstərən türk pedaqoqlarının sayı 50-dən çox idi [Rəsulzadə M.Ə., Bakı, 1990]. Onların içərisində qadınlar da var idi. Bundan başqa, Azərbaycan hərbi məktəblərində qalıb dərs deyən Qafqaz İslam Ordusunun zabitləri ilə yanaşı, bu orduda vaxtilə xidmət edən pedaqoji təhsili olan türk əsgərlərindən Azərbaycanda qalıb müəllimlik edənlər də oldu. Türkiyədən gəlmiş pedaqoqlar, əsasən, orta məktəblərdə çalışmaqla yanaşı, Gəncə, Qazax, Bakı, Nuxa və Lənkəran şəhərlərindəki seminariya və gimnaziyalarda, həmçinin pedaqoji kurslarda müəllim kadrlarının hazırlanması işində də yaxından iştirak etdilər və Azərbaycanda təhsilin milliləşdirilməsi işinə öz töhfələrini verdilər. Azərbaycan Maarif Nazirliyi Türkiyədən gələn müəllimlərə xüsusi qayğı ilə yanaşır, onlara pedaqoq kimi aldıqları məvacibdən başqa yol haqqı və ev kirayəsi xərcləri kimi əlavə maliyyə vəsaiti də ödəyirdi.

Türk pedaqoqlarının Azərbaycana göndərilməsi ilə bağlı aparılan işlər, əsasən, 1919-cu ildə öz nəticəsini verdi. Lakin 1918-ci ilin yayında müəllim kadrlarına olan tələbatı türk pedaqoqları hesabına ödəmək mümkün olmadı. Buna görə də, müəllim çatışmazlığını aradan qaldırmaq üçün Azərbaycan Maarif Nazirliyi Gəncə, Şəki, Şuşa və Zaqatalada qısamüddətli — bir-iki aylıq pedaqoji kurslar açılmasını, məktəblərdə ana dilində dərs demək istəyən digər savadlı şəxslərin də bu kurslara cəlb edilməsini qərara aldı və Nazirlər Şurası qarşısında məsələ qaldırdı ki, bu məqsəd üçün xəzinədən 126.759 rubl 50 qəpik vəsait ayrılsın. Hökumət 1918-ci il avqustun 24-də xalq məktəbləri müfəttişliyinin təsis edilməsi və xalq məktəbləri müəllimləri kurslarının təşkili

---

[11] Топчибашев А.А. (1994) Дипломатические беседы в Стамбуле (записи чрезвычайного посланника и полномочного министра Азербайджанской Республики). (1918-1919) Баку, «Эргюн».

[12] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. № 13701. s. 4.

barədə qərar qəbul etdi və bu məqsədlə Maarif Nazirliyinin tələb etdiyi məbləğdə pul buraxdı.[13] Eyni tarixdə, hökumət Nuxada kişi gimnaziyasının açılması üçün adı çəkilən nazirliyə daha 21.046 rubl 62 qəpik vəsait ayırdı[14] və bu tendensiya sonrakı dövrdə də davam etdi.

Azərbaycan hökuməti yeni ibtidai və orta məktəblər açmaqla yanaşı, 1914-cü ildən Gəncədə və 1916-cı ildən Bakıda fəaliyyət göstərən müəllimlər seminariyasının işini yenidən qurmaq üçün də addımlar atdı. Qızlar üçün ilk müəllimlər seminariyası təşkil edildi. 1918-ci ilin sentyabr ayında qızlar üçün Bakı müəllimlər seminariyasına qəbulla bağlı verilən elana görə, bura imtahansız yuxarı ibtidai məktəbi və 4 sinifli qızlar gimnaziyasını bitirən şagirdlər qəbul edilməli idi. Göstərilən təhsil senzi olmayan qızlar isə imtahan verməli idilər. Seminariyada təhsil müddəti 4 il idi. Maddi cəhətdən ehtiyacı olan, təhsildə müvəffəqiyyətlər qazanan şagirdlərə hər ay 25 rubl məbləğində təqaüd verilirdi [Nezerli E. 2010, Bakı]. Hökumət sonrakı illərdə də xalq məktəbləri, ibtidai və orta məktəblər, seminariyalar, gimnaziyalar və Bakı Universitetinin açılması istiqamətində əməli işlər gördü.

Bəhs edilən dövrdə Azərbaycanda hərbi məktəblərin açılması da prioritet məsələlərdən idi. Cümhuriyyətin yaranmasından Birinci Dünya müharibəsinin sonunadək olan dövrdə Azərbaycanda hərbi məktəblərin yaradılması və bu məktəblərdə təlim-tədris prosesinin təşkili sahəsində Qafqaz İslam Ordusunun türk zabitləri xüsusi rol oynadılar. Qeyd etdiyimiz kimi, 1918-ci ilin iyun ayında zabit kadrları hazırlamaq üçün Gəncədə yaradılan hərbi məktəbin, daha sonra avqust ayında orduda kiçik zabit heyətinə olan tələbatı ödəmək məqsədilə təşkil edilən «Ehtiyat Zabit Namizədləri Təlimgahı» adlanan hərbi məktəbin fəaliyyəti və təlim-tədris işləri türk zabitlərinin adı ilə bağlı idi.[15] Bu hərbi məktəblərin müdavimləri Azərbaycan ordusunun zabit kadrlarına olan ehtiyaclarının ödənilməsində mühüm rol oynadılar. Hərbi məktəblərin açılmasına olan ehtiyacı nəzərə alan Azərbaycan hökuməti 1918-ci il oktyabrın 27-də ölkədə daha üç yeni hərbi məktəbin açılmasına qərar verdi və bu məqsədlə 50 min rubl vəsait ayırdı.[16]

Türkiyədən Azərbaycana dərslik və digər kitabların gətirilməsi istiqamətində 1918-ci ilin yayında əməli nəticəsi olan müəyyən işlər görüldü. Bu, Birinci Dünya müharibəsinin başa çatmasından sonrakı dövrdə də davam etdirildi. Məktəblərin milliləşdirilməsi işini uğurla həyata keçirməkdə olan Azərbaycan Maarif Nazirliyi bu işin davam etdirilməsi üçün 1919-cu ilin iyul ayında məktəblərin türk dilində dərslik və dərs vəsaitləri ilə təmin edilməsi məsələsini hökumət qarşısında yenidən qaldırdı. Maarif Nazirliyi nəzdində yaradılmış komissiya Türkiyədən gətirilməli olan kitabların siyahısını tərtib etmişdi. Azərbaycan Parlamentinin 1919-cu il sentyabrın 18-də qəbul etdiyi qanuna görə, xalq kitabxanaları üçün türk dilində kitablar almaq məqsədilə Maarif Nazirliyinin sərəncamına 1 milyon rubl vəsait ayrıldı.[17] Artıq 1920-ci ilin aprel ayında Azərbaycan Cümhuriyyətində ümumi fondu 95 min nüsxə kitab olan 11 kitabxana var idi.[18] Türkiyədən Azərbaycana dərslik və digər kitabların gətirilməsi sonrakı illərdə, hətta sovet hakimiyyəti illərində də davam etdi.

Azərbaycan gənclərinin Türkiyənin ali məktəblərində təhsil alması məsələsi də maarif sahəsindəki Azərbaycan-Osmanlı əməkdaşlığında xüsusi yer tuturdu. Qeyd edək ki, bu

[13] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[14] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[15] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Alemdar. №1376-68. s. 2.

[16] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[17] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7905. s. 2.

[18] Azərbaycan tarixi (2001). 7 clddə. V c. Bakı: Elm.

sahədə ilk addımlar hələ Azərbaycanın müstəqilliyinin elan edilməsindən xeyli əvvəl atılmışdı. XIX əsrin sonu-XX əsrin əvvəllərində Əli bəy Hüseynzadə, Hüseyn Cavid, Abdulla Məmmədzadə, Məşədi Cəmil və digər Azərbaycan gəncləri fərdi təşəbbüsləri ilə İstanbuldakı ali məktəblərdə təhsil almışdılar. Birinci Dünya müharibəsinin başlanması bu tendensiyanın davam etməsinə imkan verməsə də, rus imperiyasının süqutundan sonra Azərbaycan gəncləri yenidən təhsil almaq üçün Türkiyə ali məktəblərinə üz tutdular.

Azərbaycan Cümhuriyyətinin yaranması ərəfəsində Cənubi Qafqazda yaranan anarxiya səbəbindən Bakı Hərbi Məktəbinin tələbəsi Zeynalabdin Hüseynzadənin yarımçıq qalmış təhsilini Türkiyədə davam etməsi üçün hələ 1918-ci ilin mayında Osmanlı Hərbi Nazirliyinə müraciət edilmişdi. Ənvər paşa bu müraciətə müsbət yanaşdı və 25 may 1918-ci il tarixində adı çəkilən şəxsin İstanbul Qülləli Məktəbinə qəbul edilməsi ilə bağlı hökumətə təqdimat yazdı.[19] Bu təqdimata dərhal müsbət cavab verildi. Mayın 26-da Osmanlı sultanı Mehmed Rəşad, sədrəzəm Tələt paşa və hərbi nazir Ənvər paşanın imzaladıqları «irade-i səniyyə» ilə Zeynalabidin Hüseynzadə İstanbul Qülləli Məktəbinə qəbul edildi.[20]

Qeyd edək ki, bu zaman İstanbul mətbuatında Bakılı Zeynalabidin Hüseynzadə ilə bağlı dərc olunan məqalələrdə bildirilirdi ki, o, Nargin adasındakı əsir düşərgəsində saxlanılan türk əsirlərinə yardımlar etmiş və bir çox türk zabitlərinin oradan qaçırılmasını təşkil etmişdir.[21]

Almaniyada təhsil alan rusiyalı türk-tatar gənclərinin təşəbbüsü ilə 1918-ci il aprelin 10-da Berlində «Rusiyalı Müsəlman Şagirdlərinə Yardım Cəmiyyəti» adlı bir cəmiyyət qurulmuşdu. Berlin hökuməti tərəfindən rəsmi qeydiyyata alınan bu cəmiyyət keçmiş Rusiya imperiyasının türk-müsəlman bölgələrindən olan gənclərin Almaniyada təhsil almalarına yardım etməyi qarşısına məqsəd qoymuşdu.[22] Berlin və İstanbul hökumətləri tərəfindən dəstəklənən bu cəmiyyətin rəsmi açılış mərasimində Osmanlı imperiyasının Almaniyadakı səfiri İbrahim Hakkı paşa, səfirliyin müstəşarı Ədhəm bəy, hərbi attaşe Cəmil bəy və digər türk siyasiləri ilə yanaşı, Almaniya Hərbi Nazirliyindən mayor Vuds (Woods) və digər zabitlər, Xarici İşlər Nazirliyindən von Vizindonk (Wizindong), professor Mitoviç (Mitovich), professor Mart Man (Marth Mann) və digərləri öz xanımları ilə birlikdə, həmçinin Kazan türklərinin fəallarından olan Əbdürrəşid İbrahim iştirak etmişdilər. Bu tədbirdə iştirak edən alman siyasilərindən doktor Kozak təhsil almaq niyyəti ilə Almaniyaya gələn türk-tatar gənclərindən 10 nəfərə alman milləti tərəfindən aylıq 150 mark olmaqla illik 1800 mark təqaüd təyin olunduğunu bəyan edərək, yeni qurulan cəmiyyəti bu şəkildə təbrik etmişdi.[23]

Bu cəmiyyətin sədaları Azərbaycana da gəlib çatmışdı. Azərbaycandan bir neçə gənc bu cəmiyyət hesabına Almaniyada təhsil almaq üçün onun Batumdakı təmsilçilərinə müraciət etmiş və müsbət cavab almışdılar. Gənclər Almaniyaya getmək üçün İstanbula gələn zaman burada Osmanlı xüsusi xidmət orqanı olan Təşkilatı Mahsusanın nümayəndələri onları Almaniyaya deyil, Türkiyədəki hərbi məktəblərə yönəltməyə çalışdılar. Bunu belə əsaslandırdılar ki, «Azərbaycan hökuməti bütün cavanları hərbi xidmətə dəvət etmiş və buna görə də, sizə Almaniyaya deyil, ehtiyat zabit məktəblərinə getmək lazımdır».[24] Bu tələbdən çox pərişan olan gənclər kömək üçün bu zaman İstanbulda olan Azərbaycan nümayəndə

[19] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Alemdar. № 1403-93. s. 2.

[20] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Alemdar. № 1403-93. s. 2.

[21] Rusyalı İslam Şâkirdlerine Yardım Cemiyeti (1334) Türk Yurdu, №. s. 329-330.

[22] Türkiye Cumhuriyeti Başbakanlık Osmanlı Arşivi (BOA), BEO, № 4517/338752.

[23] Türkiye Cumhuriyeti Genelkurmay Askeri Tarih ve Stratejik Etüd Dairesi Başkanlığı Arşivi (ATASE), s. 7-10.

[24] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

heyətinin rəhbəri M.Ə.Rəsulzadəyə müraciət etdilər. Gənclər hansı səfərbərlik qanunu ilə onların hərbi məktəblərə cəlb edildiyini öyrənməyə çalışmaqla yanaşı, Osmanlı dairələrinin bu tələbini yerinə yetirməkdən də imtina edir, Türkiyədə deyil, Azərbaycanda xidmət etmək istədiklərini bildirir və bunun üçün də məmləkətlərinə göndərilmələrini xahiş edirdilər. Bütün bunlar barədə Azərbaycanın xarici işlər naziri M.H.Hacınskiyə göndərdiyi 4 avqust 1918-ci il tarixli məktubunda məlumat verən M.Ə.Rəsulzadə daha sonra yazırdı: «Yaxşı olardı ki, əgər hökumətin belə bir qərarı varsa, bu qərarını elan eləsin. Buradakı gənclər və bundan sonra onların halına düşənlər haqqında müəyyən bir qərarı olsun. Azərbaycanlı gənclər buranın hərbi məktəblərinə verildikləri zaman yaxşı olardı ki, Azərbaycan hökuməti hesabına olaraq məktəbə girəydilər və çıxarkən Azərbaycan hökuməti idarəsində olaydılar. O zaman burada «çətinliyə» düşən gənclər özlərini «məzlum» hesab etməyə «bəhanə» tapmazlar və həqiqətən də ortada bir qanun, tərtib və üsula riayət edilmiş olardı. Hər halda bu xüsusda müəyyən bir qərar lazımdır. Yoxsa hər zaman bir məsələ çıxacaq ki, çox pis təsirlər edəcəkdir».[25]

Baş nazir F.X.Xoyski M.Ə.Rəsulzadəyə göndərdiyi 31 avqust 1918-ci il tarixli məktubunda bu məsələ ilə bağlı bildirdi ki, ordu üçün əsgər toplama və səfərbərlik haqqında qəbul etdiyimiz qanun və qaydaların bir surətini sizə göndərirəm. Bunlardan görəcəksiniz ki, tələbələrə 27 yaşına qədər möhlət verilir. Dolayısıyla, İstanbuldakı tələbələrlə bağlı bu qərara uyğun hərəkət edə bilərsiniz».[26]

Azərbaycan hökuməti 1918-ci il oktyabrın 29-da təhsil almaq üçün xaricə getmək istəyən azərbaycanlı tələbələrə fərdi qaydada maarif nazirinin təqdimatı əsasında icazə verilməsi haqqında qərar qəbul etdi. Bu qərara görə, ehtiyacı olan tələbələrə təqaüd təyin edilməsi məsələsinə də baxılması tövsiyə edilirdi. Bununla bağlı məsələlərin obyektiv araşdırılması üçün tələbələrin orduya çağırılması 1918-ci il noyabrın 10-na kimi təxirə salındı.[27]

M.Ə.Rəsulzadə 1918-ci ilin avqust ayında Osmanlı maarif naziri Nazim bəylə görüşü zamanı Azərbaycan üçün müəllim kadrların hazırlanması işinə yardım etmək məqsədilə İstanbuldakı pedaqoji məktəbə azərbaycanlı tələbələrin qəbul edilməsi məsələsini qaldırdı və buna razılıq aldı. O, Azərbaycan hökumətinə göndərdiyi 2 sentyabr 1918-ci il tarixli məktubunda Maarif Nazirliyindən Türkiyəyə pedaqoji təhsil almaq üçün göndəriləcək tələbə sayını müəyyənləşdirməyi və lazımi tədarüklər görülməsi üçün ona bu say barədə məlumat verilməsini xahiş edirdi.[28]

M.Ə.Rəsulzadədən sonra Azərbaycanın İstanbuldakı diplomatik missiyasına rəhbərlik edən Ə.Ə.Topçubaşov da azərbaycanlı tələbələrin Türkiyə ali məktəblərində təhsil alması məsələsini gündəlikdə saxladı. O, 1918-ci il oktyabrın 28-də Osmanlı Maarif Nazirliyinin müstəşarı ilə keçirdiyi görüşdə Azərbaycan gənclərinin təhsil almaq və ya təhsillərini davam etdirmək üçün Türkiyəyə göndərilməsi məsələsini də qaldırdı. Müstəşar, bu məsələ ilə bağlı Osmanlı maarif naziri ilə görüşüb danışıq aparmağı məsləhət bildi [Топибашев А.А., 1994]. Bu sahədə göstərilən təşəbbüslərin nəticəsi olaraq Azərbaycan gənclərinin Türkiyə ali məktəblərində təhsil alması üçün razılıq əldə edildi. Nəticədə, azərbaycanlı gənclərin Türkiyə ali məktəblərində təhsil alması təmin edildi.

Türkiyə ali məktəblərində oxuyan azərbaycanlı tələbələr arasında birlik yaratmaq və onlara maddi və mənəvi yardımlar etmək məqsədilə 1919-cu ilin oktyabrında İstanbulda Azərbaycan Türk Tələbə Cəmiyyəti adlı bir cəmiyyət də quruldu.[29]

Bir qədər sonra, 1919-cu il sentyabrın 1-də keçirilən Azərbaycan Parlamentinin 70-ci

---

[25] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

[26] «İlanat» (1335). Tercüman-ı Hakikat. № 13702. s.4.

[27] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915. s. 2.

[28] «İlanat» (1335).Tercüman-ı Hakikat. № 13702. s.4.

[29] Azerbaycan Murahhası'nın Murahhasımıza Beyanatı ( 1334) Tasvir-i Efkar. № 2576. s.1.

iclasında 100 nəfər azərbaycanlı tələbənin təhsil almaq üçün dövlət hesabına xarici ölkələrin ali məktəblərinə göndərilməsi ilə bağlı qərar qəbul edildi.[30] Bu tələbələrdən 9 nəfəri Türkiyəyə göndərilməli idi. 1920-ci ilin yanvar ayında Bakıdan təntənə ilə yola salınan bu gənclər müxtəlif ali məktəblərə qəbul olundular. Tədris ilinin ortası olduğu üçün bəzi gənclərin ali məktəblərə dinləyici kimi qəbul edilməsi, yeni tədris ilindən isə tələbə kimi dərslərə başlamalarına qərar verildi. Məsələn, Azərbaycan hökuməti tərəfindən göndərilən 1892-ci ildə Zaqatala qəsəbəsində anadan olan Məhəmməd Zəkinin Osmanlı Mülkiyyə Məktəbinə qəbul olunması ilə bağlı Osmanlı hökumət orqanları arasında 1920-ci ilin fevral-aprel aylarında gedən yazışmalardan görünür ki, cari tədris ilinin sonuna az qaldığı üçün adı çəkilən məktəbə tələbə qəbulunun mümkünsüz olduğu məlum olur. Lakin Məhəmməd Zəkinin Azərbaycan Cümhuriyyəti hökuməti tərəfindən göndərilmiş olduğu əsas gətirilərək bu müraciət rədd edilmir və o, adı çəkilən məktəbə dinləyici kimi qəbul olunur. Yeni dərs ilinin başlanğıcında isə Məhəmməd Zəkinin verəcəyi imtahan nəticələrinə uyğun olaraq onun məktəbin birinci sinfinə qəbul olunacağı qərarlaşdırılır.[31] Bu sənədlərdə Məhəmməd Zəkinin bütün təhsil xərclərini Azərbaycan Maarif Nazirliyinin öz üzərinə götürdüyü də qeyd olunur.

Osmanlı arxiv sənədlərində 1920-ci ilin aprel işğalından sonrakı dövrlərdə də Azərbaycan gənclərinin Türkiyə ali məktəblərinə qəbul olunması və onlara güzəştlərin edilməsi ilə bağlı sənədlər vardır. Məsələn, 1922-ci ilin martında sabiq Azərbaycan Cümhuriyyəti hökumətinin maliyyə naziri Əbdüləli bəy Əmircanov, oğlu Rüstəm Fuad Əfəndinin Qalatasaray liseyinə ödənişsiz olaraq qəbul olunması xahişi ilə Osmanlı Maarif Nazirliyinə müraciət edir. Bu zaman ödənişsiz plan yerləri artıq dolduğundan, Osmanlı maarif naziri Said bəy, bu xahişlə bağlı müvafiq qərar verilməsi üçün martın 28-də sədarətə müraciət edir.[32] Osmanlı sədrəzəmi, 1922-ci il aprelin 1-də Ə.Əmircanovun vəziyyətini nəzərə alaraq, istisna hal kimi onun oğlunu adı çəkilən liseyə ödənişsiz olaraq qəbul olunmasına icazə verir.[33]

Azərbaycanla bağlı Osmanlı ictimaiyyətinə məlumatların verilməsi və Azərbaycan mədəniyyətinin Türkiyədə təbliğ olunması istiqamətində 1918-ci ilin yayında İstanbul konfransına göndərilən Azərbaycan nümayəndə heyətinin burada gördüyü işlər də təqdirəlayiqdir. Heyət rəhbəri M.Ə.Rəsulzadə, 1918-ci il sentyabrın 6-da «Türk Ocağı»nda Azərbaycanın tarixi, siyasi, iqtisadi, ictimai, ədəbi və sair xüsusiyyətləri ilə bağlı böyük bir konfrans verdi. Konfransda iştirak edən türk ziyalıları və ictimaiyyəti nümayəndələrinə Azərbaycanın tarixi, dili, ədəbiyyatı və sənəti ilə bağlı geniş məlumat verildi, rus inqilabından sonra ölkədə gedən siyasi və hərbi proseslər təhlil edildi və qarşıda dayanan vəzifələr haqqında məlumat verildi.[34] Bu konfransla bağlı hələ bir neçə gün əvvəldən İstanbul qəzetlərində elanlar verilmişdi.[35] Buna görə də konfransda iştirak edənlərin sayı kifayət qədər çox idi.

1918-ci il sentyabrın 14-də Türkiyə, Azərbaycan, Şimali Qafqaz və türk dünyasının digər bölgələrindən gəlmiş nümayəndələrin iştirakı ilə «Türk Ocağı»nda bir rəsmi qəbul keçirildi. Halidə Edip, Nakiyə Nigar, Bilkeys, Haticə Əli kimi türk xanımlarının da qatıldıqları bu rəsmi qəbulda azərbaycanlılardan Ə.Ağaoğlu və Ə.Hüseynzadə, Qafqazın tanınmış iqtisadçılarından Fərah Vəzirov, Krım səfiri Hayri Ayvazov və digər ictimai-siyasi xadimlər iştirak

[30] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7905. s. 2.

[31] Azerbaycan Tiyatrosu (1335). Zaman. № 305. s. 2.

[32] Azerbaycan Hariciye Nazırı ile Gayri Siyasî Bir Mülakat (1334).Temaşa. № 8. s. 12.

[33] Azerbaycan Hariciye Nazırı ile Gayri Siyasî Bir Mülakat (1334).Temaşa. № 8. s. 12.

[34] Türk Ocağı'nda Resmikabul (1334). Yeni Gün, № 14. s. 2.

[35] Азербайджанская Демократическая Республика (1918-1920). (1998) Законодательные акты. (Сб. Документов). Баку: Азербайджан.

edirdilər. Türk xalqlarının opera, musiqi və ədəbiyyat nümunələri nümayiş etdirilən və səsləndirilən bu rəsmi qəbulun keçirilməsində əsas məqsəd bu xalqların ictimai-siyasi və ədəbi dairələri arasında yaxın münasibətlərin qurulması idi [Топчибашев А.А., 1994].

Bir qədər sonra, 1918-ci ilin oktyabr ayında Bakıda da «Türk Ocağı» adlı cəmiyyət yaradıldı. Cəmiyyətin məqsədi Azərbaycan və Osmanlı türkləri, habelə keçmiş Rusiya imperiyası ərazisində yaşayan türk xalqları arasında mədəni əlaqələri inkişaf etdirməkdən və onları bir-biri ilə yaxınlaşdırmaqdan ibarət idi. Müsavat partiyasının Bakı Komitəsinin təşəbbüsü ilə 1919-cu ilin dekabr ayında «Türk Ocağı»nın siyasi klubunun açılması qərara alındı. Bu məqsədlə tərkibində M.Ə.Rəsulzadə, R.R.Şərifzadə, Ş.Rüstəmbəyov, R.Ağabəyov, Seyid Hüseyn və M.Şeyxzamanov kimi məşhur siyasi xadimlər və mədəniyyət nümayəndələrinin daxil olduqları komissiya yaradıldı.[36]

Müsavat partiyası üzvlərinin iştirakı ilə Bakıda «Türk gecələri» adlanan təntənəli musiqi konsertləri təşkil olunurdu. Konsert proqramlarının hazırlanması və tərkibinə xüsusi komissiya nəzarət edirdi. Proqramlar kifayət qədər maraqlı və orijinal idi, burada digər türk xalqlarının da musiqisinə geniş yer verilirdi. «Türk gecələri» konsertlərində Azərbaycan, Türkiyə və tatar şairləri, artistləri və rəssamları təmsil olunurdular. Dövlət truppasının aktyorları isə türk xalqlarının milli həyatından bəhs edən əsərlərin tamaşasını göstərirdilər. Bu əsərlərin «Azərbaycan müstəqilliyi», «Türk tipləri», «Türk qadınının dünyası», «Milli birlik» və s. kimi adları onların məzmunu barədə aydın təsəvvür yaradır. Türk xalqlarının etnoqrafiyası və məişətinə həsr olunmuş «Türk ocağı», «Türkmən çadrası», «Atəşgah», «Şərq salonları» kimi sərgilər təşkil olunurdu. Bu tədbirlərdə ictimaiyyət nümayəndələri ilə yanaşı, dövlət və hökumət nümayəndələri də iştirak edirdilər.[37]

Azərbaycan və Osmanlı imperiyası arasında mədəni əlaqələrin inkişaf etdirilməsi və Azərbaycan mədəniyyətinin Türkiyədə təbliğ olunması istiqamətində teatr truppaları, bir qədər sonra isə Azərbaycan Türk Dram Teatrı da əvəzsiz xidmətlər göstərmişdir. Bəhs edilən dövrdə Azərbaycan teatr sahəsində Türkiyədən irəlidə idi. Azərbaycan teatr truppalarının tamaşalarında qadınların rol alması Türkiyədə böyük əks-səda doğurmuş və bununla bağlı 1918-ci ilin avqust-sentyabr aylarında İstanbul mətbuatında heyrət dolu məqalələr, müsahibələr dərc edilmişdi.[38] Bu məqalələr İstanbulda Azərbaycan teatrına böyük maraq oyandırdı.

1918-ci ilin oktyabr ayında Azərbaycan Türk Dram Operetta kompaniyası Türkiyəyə qastrol səfərinə yola düşdü. Azərbaycan artistlərinin qastrol səfəri təkcə İstanbulda dörd aya qədər davam etdi. 1919-cu ilin yanvar-may ayları ərzində İstanbulda səfərdə olan Azərbaycan Türk Dram Operetta kompaniyası buradakı teatr salonlarında bir çox Azərbaycan tamaşalarını səhnələşdirdi. Azərbaycan teatr truppası 1919-cu il fevralın 5-də İstanbulun Şahzadəbaşındakı Millət Teatrında gündüz xanımlar üçün, axşam isə ümumi olaraq iki dəfə «Arşın mal alan», fevralın 6-da Kadıköydəki Kuşdili (Apollon) Teatrında «Məşədi İbad»[39], fevralın 8-də Millət Teatrında gündüz və axşam olmaqla iki dəfə «Dağılan tifaq, yaxud qumarın nəticəsi»[40], fevralın 10-da həmin teatrda «Əlli yaşında cavan» və «Ac həriflər»[41], fevralın 12-də eyni teatrda «Hacı Qənbər»[42], fevralın 13-də Kuşdili Teatrında «Əlli yaşında cavan» və «Ac həriflər»[43], fevralın 14-də Təpəbaşı Qış

[36] Azərbaycan tarixi.(2001).7 clddə. V c. Bakı: Elm.

[37] Azərbaycan tarixi.(2001).7 clddə. V c. Bakı: Elm.

[38] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tasvir-i Efkar. № 16. s. 2.

[39] Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi (ARPİİSSA), f. 277, siy. 2, iş 7.

[40] Azerbaycan Türk Dram-Operet Kumpanyası( 1335). Tasvir-i Efkar. № 2648.s. 2.

[41] BOA, DH.HMŞ, № 4-1/4-96.

[42] Azərbaycan tarixi.(2001).7 clddə. V c., Bakı: Elm.

[43] Azerbaycan Türk Dram-Operet Kumpanyası'nın Oyun Reklamı (1335). Temaşa. № 6.

Teatrında «Arşın mal alan»[44], fevralın 19-da Millət Teatrında gündüz və axşam olmaqla iki dəfə «Bəxtsiz cavan», ertəsi gün Kuşdili Teatrında «Zora təbib» və «Axşam səbri xeyir olur»[45], fevralın 22-də Millət Teatrında «Qave-i Ahəngər»[46], fevralın 26-da «Şeyx Şamil həzrətləri»[47], martın 10-da Kuşdili Teatrında gündüz və axşam olmaqla iki dəfə «Əsli və Kərəm», martın 11-də Bəyoğludakı Odeon Teatrında «Arşın mal alan»[48], martın 12-də Millət Teatrında «Əsli və Kərəm»[49], martın 13-də Kuşdili Teatrında gündüz və axşam olmaqla iki dəfə «Qave-i Ahəngər»[50], martın 19-da Millət Teatrında gündüz və axşam olmaqla iki dəfə «Ağa Məhəmməd Şah Qacar»[51], martın 24-də Odeon Teatrında «Məşədi İbad»[52], martın 26-da Millət Teatrında «Ölü ikən bekar»[53], aprelin 16-da Millət Teatrında «Ər və arvad», Bəyoğludakı İsketinq Teatrında «Arşın mal alan»[54], aprelin 18-də İsketinq Teatrında gündüz və axşam olmaqla iki dəfə «Məşədi İbad» [Nezerli E, 2010, Bakı], ertəsi gün yenə eyni teatrda «Evli ikən bekar» [Rəsulzadə M.Ə., Bakı, 1994], aprelin 23-də Millət Teatrında gündüz və axşam olmaqla iki dəfə «Leyli və Məcnun»[55], mayın 17-də Millət Teatrında «Pəri cadu», «Bir kamerada iki yataq»[56] və digər tamaşalarını səhnəyə qoydular. Bu çıxışlar zamanı səsləndirilən «İlk bahar», «Marş», «Papuri», «Gecə həyatı», «Vals», «Çoban qutusu», «Bənd oldum» və digər Azərbaycan mahnıları böyük marağa səbəb olmuşdu.[57] Azərbaycan teatr truppasının bu çıxışları Azərbaycan mədəniyyətinin Türkiyədə təbliğində mühüm rol oynamaqla iki ölkə arasında mədəni əlaqələrin inkişafına da böyük təsir göstərdi. Azərbaycan teatr truppasının İstanbuldakı fəaliyyəti Osmanlı mətbuatı tərəfindən geniş şəkildə işıqlandırıldı.

Zaman qəzetinin 8 fevral 1919-cu il tarixli nömrəsində Azərbaycan teatrı haqqında böyük bir məqalə nəşr edilmişdi. Məqalədə yanvar ayından bəri İstanbulda olan Azərbaycan Türk Dram Operetta kompaniyasının səhnəyə qoyduğu tamaşalar haqqında geniş məlumat verilir və teatr sahəsində Azərbaycanın Türkiyədən çox-çox irəlidə olduğu faktlarla göstərilirdi. Məqalədə deyilirdi: «Bir millətin mədəniyyətə olan qabiliyyət və istedadını hərbi müvəffəqiyyətlərdən çox müxtəlif mədəni müəssisələri, mövcud əsərləri ilə ölçmək daha doğrudur... Biz Azərbaycandan şəhərimizə gələn teatr heyətindən çox şeylər öyrəndik. Dünyanın bu qədər böyük böhranlar və məhrumiyyətlər içində olduğu bir zamanda, xüsusilə də Azərbaycan kimi ağrılı-acılı həyat mübarizələri içində çırpınan bir məmləkətin İstanbula mükəmməl bir kompaniya göndərməsini gözləyə bilməzdik. Bizim ən seçilmiş sənətkarlarımızdan biri onlardan bəhs edərkən, dedi ki, «kompaniyalarında elə bir ahəng və intizam var ki, indiyə qədər bizim heç bir teatrımıza bu nəsib olmadı, vəzifə bölgüləri yaxşıdır, heç bir iş heç bir kəsin nisbətindən dolayı axsamır».[58] Məqalədə Azərbaycanda yazılan teatr əsərləri barədə məlumatlı olmayan

[44] Azərbaycan Türk Deam-Operat Kumpanyası (1335). Tercüman-ı Hakikat. № 13705. s.4.

[45] Kafkas Terakki Cemiyeti (1334). Zaman. № 93. s.3.

[46] Azerbaycan Türk-Dram Operet Kumpanyası: Aslı ve Kerem (1335). Alemdar. № 1390-80. s.2.

[47] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335).Tercüman-ı Hakikat. № 13700.

[48] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. № 10498. s 2.

[49] Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920). 1998. Parlament (Stenoqrafik hesabatlar). 2 cilddə. C. II. Bakı: Azərbaycan.

[50] Azerbaycanlı Talebenin Nazarıdikkatine (1335). Türk Dünyası. № 69. s.3.

[51] BOA, DH.İ.UM, № 5-2/1-18.

[52] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. № 10503 .s.2.

[53] BOA, BEO, № 4708/353091, v.2.

[54] Kafkasya'da Esir Osmanlı Zabitleri (1334). Ati. № 173. s.2.

[55] Resulzade Mehmed Emin Bey'in Konferansı (1334). Yeni Gün, №6, s.2.

[56] BOA, İ.DUİT, № 163/12.

[57] Resulzade Mehmed Emin Bey'in Konferansı (1334). Yeni Gün, №6, s.2.

[58] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. № 13644. s.4.

İstanbul teatrsevənlərinə bu əsərlər haqqında geniş məlumat verildiyi də xüsusi olaraq qeyd edilirdi.[59]

Azərbaycan teatr truppasının aktyorları oynadıqları rollarla böyük tamaşaçı sevgisi qazanmışdılar. Onlardan Əşrəf bəy Yüzbaşızadə, Muhsin bəy Cəfərov, Həsən bəy Abdullazadə, Mustafa bəy Mərdanov, Paşa bəy Məhəmmədov, İbrahim bəy İsfahanlı, Hüseyn Qasımov və digərləri ilə bağlı İstanbul mətbuatında məlumat tipli məqalələr və onların şəkilləri dərc edilmişdi.

Beləliklə, bütün bunları ümumiləşdirərək qeyd edə bilərik ki, Azərbaycan Cümhuriyyəti hökuməti yarandığı ilk gündən etibarən ölkənin ərazi bütövlüyü və suverenliyini təmin etmək üçün ciddi addımlar atmaqla yanaşı, ölkənin dirçəlişi naminə əsas amil hesab etdiyi maarif və mədəniyyətin inkişafına da böyük əhəmiyyət vermiş, ölkədə sabitlik möhkəmləndikcə bu sahəyə daha çox diqqət ayırmağa başlamışdır. Azərbaycan hökuməti hərbi-siyasi və iqtisadi sahələrdə olduğu kimi, maarif sahəsində də dost və qardaş Türkiyə ilə əməkdaşlıq etmiş, onun köməyindən və təcrübəsindən faydalanmışdır. Azərbaycanda məktəblərin milliləşdirilməsi prosesində türk pedaqoqlarının, həmçinin Türkiyədən gətirilən dərslik və dərs vəsaitlərinin rolu böyük olmuşdur. Azərbaycanla Türkiyə arasında hərbi-siyasi və iqtisadi sahələrdə qurulan münasibətlər Birinci Dünya müharibəsinin başa çatması ilə iflasa uğrasa da, mədəni-maarif sahəsində iki ölkə arasında əlaqələr əslində bu dövrdən sonra yüksələn xətlə inkişaf etmişdir. 1919-cu ili Azərbaycanla Türkiyə arasında mədəni-maarif sahəsində ən məhsuldar il hesab etmək olar.

[59] Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. № 13644. s.4.

**İstifadə edilmiş ədəbiyyat**

1. «İlanat» (1335).Tercüman-ı Hakikat. №13702. s.4.
2. Azerbaycan Cumhuriyeti'nde Maarif (1334). Ati. № 215. s.2.
3. Azerbaycan Hariciye Nazırı ile Gayri Siyasî Bir Mülakat (1334).Temaşa. № 8. s.12.
4. Azerbaycan Murahhası'nın Murahhasımıza Beyanatı ( 1334) Tasvir-i Efkar. № 2576. s.1.
5. Azerbaycan Tiyatrosu (1335). Zaman. №305. s 2.
6. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Alemdar. № 1403-93.
7. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Alemdar. №1376-68.
8. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7905.
9. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7915.
10. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İkdam. № 7934.
11. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). İstiklal. № 79.
12. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. № 10546.
13. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. №10505.
14. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tasvir-i Efkar. № 16.
15. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. №13701.
16. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335).İkdam. № 7901.
17. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. №13644.
18. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tercüman-ı Hakikat. №13700.
19. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. № 10498.
20. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Sabah. № 10503.
21. Azerbaycan Türk Dram-Operet Kumpanyası (1335). Tasvir-i Efkar. № 2648.
22. Azerbaycan Türk Dram-Operet Kumpanyası'nın Oyun Reklamı (1335). Temaşa. № 6.

23. Azerbaycan Türk-Dram Operet Kumpanyası: Aslı ve Kerem (1335). Alemdar. № 1390-80.
24. Azerbaycanlı Talebenin Nazarıdikkatine (1335). Türk Dünyası. № 69.
25. Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920). 1998. Parlament (Stenoqrafik hesabatlar). 2 cilddə. C. II. Bakı: Azərbaycan.
26. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi (ARPİİSSA), f. 277, siy. 2, iş 7.
27. Azərbaycan tarixi (2001). 7 cilddə. V c., Bakı: Elm.
28. Azərbaycan Türk Deam-Operat Kumpanyası (1335).Tercüman-ı Hakikat. №13705. s.4.
29. Kafkas Terakki Cemiyeti (1334). Zaman. №93.
30. Kafkasya'da Esir Osmanlı Zabitleri (1334). Ati. № 173. s.2.
31. Nezerli E. (2010). Cumhuriyet Döneminde Azerbaycan`da Milli Eğitim Uzmanlarının Hazırlanması (1918-1920) / Büyük Devletler Kıskacında Bağımsız Azerbaycan (1918-1920). s. 350-354.
32. Resulzade Mehmed Emin Bey'in Konferansı (1334). Yeni Gün, №6.
33. Rəsulzadə M.Ə. (1990) Azərbaycan Cümhuriyyəti. Bakı, Elm.
34. Rusyalı İslam Şâkirdlerine Yardım Cemiyeti (1334) Tanin, № 3414.
35. Rusyalı İslam Şâkirdlerine Yardım Cemiyeti (1334) Türk Yurdu, №
36. Türk Ocağı'nda Bir Konferans (1334). İkdam, № 7747. s.2; «Azerbaycan Hakkında Konferans», (1334) Vakit, № 313.
37. Türk Ocağı'nda Resmikabul (1334). Yeni Gün, № 14.
38. Türkiye Cumhuriyeti Başbakanlık Osmanlı Arşivi (BOA), BEO, №. 4517/338752.
39. Türkiye Cumhuriyeti BOA, BEO, № 4708/353091, v. 2.
40. Türkiye Cumhuriyeti BOA, DH.HMŞ, №4-1/4-96.
41. Türkiye Cumhuriyeti BOA, DH.İ.UM, № 5-2/1-18.
42. Türkiye Cumhuriyeti BOA, İ.DUİT, № 163/12.
43. Türkiye Cumhuriyeti Genelkurmay Askeri Tarih ve Stratejik Etüd Dairesi Başkanlığı Arşivi (ATASE) .
44. Азербайджанская Демократическая Республика (1918-1920). (1998) Законодательные акты. (Сб. Документов). Баку: Азербайджан.
45. Топчибашев А.А. (1994) Дипломатические беседы в Стамбуле (записи чрезвычайного посланника и полномочного министра Азербайджанской Республики. 1918-1919), Баку, «Эргюн».